# Molla Nəsrəddin



# ملّا نصرالدّین

Hazırladı: Cavid Ağa

اغآ دیواج :یدالرضاح

5 camadiələvvəl 1328 **Beşimci il** 25 апреля 1910 г.

ملا نصر الدين

№17 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 к. № 17




Litoq. S.Bıxova

– Oradan bir «Həqiqət» qəzetəsi ver.

Qəzet satan: – Biz müsəlman qəzetəsi saxlamırıq. O səbəbə ki, dünya xəlq olunandan indiyədək sən əvvəlinci müsəlmansan ki, müsəlman qəzetəsi istəyirsən.

## ƏDƏBİYYAT
**(Bənzətmə)**

Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!
Üzün oldisə gər külfət yanında qarə, səbr eylə!

---

Əsiri-qeydi-fəqr oldun, yazıq, təslimi-hirman ol!
Çalışma, bir işə getmə, fəqət məyusü nalan ol!
Qəzayə çarə yox, giryan ol, üryan ol, pərişan ol!
Səbur ol, şakir ol, yəni müsəlman ol! Müsəlman ol!
Çatar öz rizqi-məqsumun, dolan avarə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---



Məaşın ta ki, təng oldu, ənis ol dərdü möhnətlə!
Boş ol, süst ol, ümidin qət qıl, yar ol ətalətlə!
Bunu təqdirə nisbət ver, yaşa daim rəzalətlə!
Həvadə seyr edən insana baxma çeşmi-qeyrətlə!
Burax kəsbi, unut səyi, yapışma karə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---



Yetərkən zalimin zülmü sənə, dövri-qəzadan bil!
Çatarkən amirin zəcri, onu seyri-səmadan bil!
Özün öz iczinə bais olurkən, masəvadan bil!
Bu məşumiyyəti biganədən gör, aşinadan bil!
Əzil, pamal ol, axtarma buna bir çarə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---



Əgər çox təngdil olsan bu işdən, qıl fəğan, ağla!
Girişmə başqa bir tədbirə, ancaq hər zaman ağla!
Bütün dünyadan əl çək, aşikar ağla, nihan ağla!
Qapansın gözlərin, fikrin, düşünmə, görmə, yan, ağla!
Tüpür namusa, baxma nəngə, gəlmə arə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---

Fəqət bir iş də görmək istər isən, gör müsəlmantək!
Təhəmmül eylə cövri-mülkədara, işlə heyvantək!

Çalış, ək, biç, aparsın bəy, evin qalsın dəyirmantək!
Ayılma, haqqını qanma, xəbərdar olma insantək!
Darılma, incimə, tab eylə hər azarə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---

Və gər az-çox var isə qeyrətin kafirlərə baxma!
Bir asan kəsbə məşğul olmaq ilə «dindən» çıxma!
Uşaqlarçın çörək çıxsın – deyə ha «din» evin yıxma!
Vəbalın boynuma, get fəhləlik et, qəlbini sıxma!
Sənə iş sahibi pul verməsə, yan narə, səbr eylə!
Bəlayi-fəqrə düşdün, razı ol, biçarə, səbr eylə!

---

Və yaxud gər əsər varsa canında zurü qüvvətdən,
Qolun güclü, üzün qansız, dilin xalisə rəhmətdən,
Qutar birdəfəlik dərdü aləmdən bari-möhnətdən!
Quduzluq iştə bir pişə, gözəl hər dürlü sənətdən!
Bas al, kəs al, vur al, yıx al, qoşul füccarə, fəxr eylə!
Məqami-hörmətə çatdın, dəxi həmvarə fəxr eylə!

---

Yanaş əşrarə, fəxr eylə!
Bulaş hər karə, fəxr eylə!
Tutulma nəngə, namusa,
Utanma arə, fəxr eylə!

*(..........)*

---

## ETİDALİYYUN

Qorxma, osmanlıca yazmıram! Türkcə öz dilimizdə yazacağam. Yoxsa başdan «etidaliyyun» sözünü görüb elə xəyal elərsən ki, biz də «osmanlılaşdıq», yəni ərəbləşdik, yəni mötəbər qələm sahiblərinin cərgəsinə soxulduq. Maşallah, qəzetələrimizi görəndə adamın tamahı düşür; lap elə bil ki, təzə Osmanlıda çıxan «Hikmət» qəzetəsidir ki, mərhum Mülkümxan deyən kimi, maşallah adını da oxumaq olmur ki, biləsən bari nə qəzetədir.

Bəli, yenə Osmanlı padşahının tərifi başlanır. Nə olar, qoy başlasın. Amma dəxi demə ki, «dünyanın yox yerdən vücuda gəlməyinə bais sultanımızdır».

Və bir də mən bilmirəm ki, bu təşvişə səbəb nədir və bilmirəm kim sənin sultanını pisləyir ki, sən ona rədd yazırsan və bu tərifi və təhsini kimə yazırsan?

---

İndiyə kimi yuxarıda dediyim sözlər «min babət» heçdir; o sözü ki, doğrudan və ciddən yazmaq istəyirəm, yəni zarafatı kənara qoyub yazmaq istəyirəm, o sözlər haman aşağıdakı sözlərdir ki, indi ərz edirəm.

---

Əgər İrağı bir dəqiqəliyə Avropa ilə tətbiq eləsək, yəni tutuşdursaq, çox məzəli nəticə qabağımıza çıxar.

Məsələn, bu cür danışaq. Necə ki, ağalara məlumdur, Avropada hər nə qədər firqə var, hər nə qədər məslək və əqidə əmələ gəlir, bunlar hamısı bir cür qayda və qanun ilə başa gəlir; yoxsa başı çuvaldan deyil. Amma İranda bunlar ittifaqi bir şeydir; bir gün filan ağa filan məclisdə plovdan qabaq bir söz fərmayiş edib, dəxi qurtardı getdi.

«Yəni bu sözü ağa fərmayiş elədi?» Bəli, bəli. «Yəni sən öz gözün ilə eşitdin?» Bəli, bəli. «Yəni sən öz qulaqlarınla gördün?» Bəli, bəli, səhihdir.

---

Deməк olar ki, indi İranda papaqların fasonu o qədər artıq deyil, nə qədər ki, cürbəcür məsləklər moddadır; məsələn, məşrutəpərəst, inqilabiyyun, ictimaiyyun.

Çox gözəl, indi siz məgər bilirsinizmi ki, iranlı, məsələn, «ictimaiyyun» deyəndə nə demək istəyir? Məgər iranlı məşruə ilə məşrutəyə təfavüt qoyur? Xeyr, qoymur və çox yaxşı eləyir ki, qoymur, çünki təfavüt qoyanlar da heç özləri bilmirlər ki, niyə təfavüt qoyurlar.

Genə sözümüz burada deyil; sözümüz buradadır ki, qoy neçə firqə olur-olsun, neçə məslək-olur olsun, lakin bu məsləklər haradan baş verir, mən onu bilmək istəyirəm və hünər istər ki, bir Allah bəndəsi məni başa sala görəm ki, bu məsləklər haradan törəyir?

Hələ gözün aydın olsun!

Hə, nə var? Nə olacaq, canına sağlıq. Deyirlər – İranda bir firqə də əmələ gəlib. Sən Allah? Vallah. Onun adı nədir?

– **Etidaliyyun.**

---

– Doğrudan, lap elə bil ki, Avropadır; elə bil ki, məsələn, Almaniyada Marksdır. Haman Marks ki, ictimaiyyun – amiyyun məsləkinin banisi və atası hesab olunur. Doğrudan bu İranda dəxi nələr qaldı ki, baş verməmiş olsun. Heç Almaniyadan geri qalmır.

İndi mən axır müntəzir qaldım! Axır bir de görüm ki, bu təzə firqənin yaradıcısı kimdir? Yəni kimdir «Etidalüyyun» firqəsini icad edən?

Tehranda Vəzirzadə və kargüzar Rəhimzadə cənabları, Təbrizdə də Siqqətül-islam həzrəti-aliləridir.

İndi görək bu firqənin məramnaməsi nədir.

Əvvəl bir lüğətə baxaq: Etidaliyyun – «dal» sözündən əmələ gəlir. Məlumdur ki, mollaların yan ciblərindən savayı bir dənə gizlin dal cibləri də olur. Cəmiyyəti-xeyriyyə ya maarif işlərindən ötrü pul yığanda mollalar əllərini yan ciblərinə salıb və ciblərinin torbalarını çıxarıb çörək qurusunu silkirlər divarın dibinə və and içirlər ki, «vallah, bir qəpiyim də yoxdur». Amma pulları dal ciblərində gizlədirlər.

Odur təzə firqənin adını qoyublar «Etidaliyyun», yəni camaatın pulunu dal ciblərinə qoyanlar.

Vallah, o qədər sözüm var ki, qorxuram hamısını yazam, çox uzun ola. Burada pis adamlara lənət oxuyub durub yataq, çünki gecənin yarısıdır.

Ya Allah...

*Molla Nəsrəddin*




Əncümən belə qərar qoydu ki, üçüncü şöbədə coğrafiya oxunsun və Əncümən üzvləri növbə ilə dərslərə nəzarət edib müəllimlərə dəsturül-əməl versinlər.




Ərizəçi – Ay ağa, xahiş edirəm ərizələrimi qəbul edəsiniz və oğlanlarıma metrik şəhadətnaməsi verəsiniz ki, dərsə qoyum.
Siğlədar – Kişi, dəli olmamısan ki? Üç uşağa da birdən şəhadətnamə çıxartmaq olar. Belə iş harada görsənib?
Секретаръ (Удивленный): Какъ!.. метрическое свидительство?.. Сразу всем тремъ сыновьямъ?.. Ты с ума сошел?..

## HƏYA

Bir var – avamlıq, bir də var – həyasızlıq.

Avamlıq odur ki, bir kəs yaxşı ilə pisə təfavüt qoymur, amma həyasızlıq odur ki, bakılı bilir flan iş pisdir və pis bilə-bilə genə filan işi tutur.

***

Rəştdə bakılılar həmişə teatroya gedəndə bilet almayıb zor ilə girirlər. Biçarə iranlılar elə bilirlər ki, dünyada teatra biletsiz də girmək olar, amma yazıqlar bilmirlər ki, bir belə bihəyalıq ancaq Bakıda olar.

---

## QOYMA HA

Molla, özün işləri təsvib qıl,
Lənətə gəlmişləri tədib qıl!

Lap yekəlib tazələr artmaqdadır,
Köhnələri dərdi saraltmaqdadır,
Məktəbə sibyanları dartmaqdadır.
Olma riza, layihə tərtib qıl,
Lənətə gəlmişləri tədib qıl!

Millət uyub onlara azğınladı,
Fikr, əqidə hamı pozğunladı,
İş böyüdü, mərəkə qızğınladı.
Lən elə, təkfir elə, təzib qıl,
Lənətə gəlmişləri tədib qıl!

Yığ başuva Baki revolbazların,
Gəncə, Nuxa, Qələ qumarbazların,
Həm İrəvan məscidi qanmazların,
Əmr elə, bir xanəni təxrib qıl,
Lənətə gəlmişləri tədib qıl!

Möminə boylə yaşamaq ardır,
Rahət olarmı o ki, dindardır
Mətləbimiz dirhəmü dinardır.
Eylə kərəm, pulları dərcib qıl,
Lənətə gəlmişləri tədib qıl!

Müşkilə salma işi, təshil elə,
Eylə danos hakimə, təcil elə,
Səy elə imanını təkmil elə,
Mollasan, əxlaqını təhzib qıl,
Mömin, özün işləri təsvib qıl!

Çəkmə camaatdən ötür dərdi-sər,
Çək önünə elmü fünunun çəpər.
Sazla cibişdanını, ol bəxtəvər,
Kəndini məclislər üçün zib qıl!
Ziynət üçün pulları dərcib qıl!
Lənətə gəlmişləri tədib qıl!

*Məşədi Sijimqulu*

## ELAN

**Neçə illər diz üstə oturub məxsusi nifaq elmləri öyrənmişəm. Ələlxüsus, şiə və sünni arasına nifaq salmaqda bəndənizin təcrübəsi Buxara-yi-şərifdə olanlardan ikmaldır. İki ildən bəridir çox zəhmət ilə sünni və şiə – hər birisi ayrı məzhəbə qulluq etmələrini öyrətmişəm. Bikar olanda həkimlik və duaya da məşğul oluram. Bu barədə ictihad yetirməyə görə «leksiya» oxuyuram. Gəncədə vəkilim Molla Məsum, Badikubədə Dağlı məhəlləsində olan cindardır, Aşqabadda bir uzunsaqqal, əmrudboğaz keçi ağadır və qeyri şəhərlərdən talib olanlar bu adresə müraciət buyursunlar: Şuşa, Şeytanzadə.**

## AVTOMOBİL

Bir məsələ var ki, deyərlər «besyar səfər bayəd».* İndi necə ki, qeyri işlərdə – ticarətdə və hər işdə bir məşvərət lazımdır, heç olmasa adam atasına və böyüyünə gənəşməsə də, yaxşı «İxtiyarat» kimi kitablarımız var; saat yoxlamağa zəhmət çəkib təqvim dürüst ediblər. Məgər adam özü özbaşınadı? Özü öz başına olan vaqondur, avtomobildir ki, atsız, malsız özü öz başına gedir. Odur ki, o da özbaşına iş görməyinə görə zərər gətirir. Məsələn, Quba yolunda avtomobil beş gün işləyir, 25 gün yatır. Gah yol xarab olur, gah rezin qırılır, gah maşınları sınır. Habelə Petrovski ilə Teymurxanşura arasında avtomobil sahibi Sadıq Əminov gündə nə qədər zərər çəkir. Başladığı iki aydır üç dəfə işləyib, üç dənə avtomobil şikəst olub, atılıb qalıbdır; poçinkaya ehtiyacı var və gah həkimlər mane olub cürbəcür təkliflər etməklə uşağı qoymurlar işləmyə. İndi bu uşaq hərgah siftədən hacıya məsləhət etsəydi, əlbəttə ki, hacı kitablara rücu edib biləcək idi ki, avtomobil lüğətdə «aftəm» il bil deyən sözdür. Hacı gah bunun afət, yəni zərər olmağın duydu, ey vallah əgər ona iqdam edəydi. Heç olmasaydı, laməhalə hacı bu 20-25 əmələ ki, bu işə lazım idi, Dərbəndin kasıb müsəlman uşaqlarından saxlardı, çünki əlhəmdülillah zəmanəyə görə Dərbənddə dəxi uşaqlar o qədər çirkin və nifrət etməli ki, deyillər; qərəz ki...

*İmza: Kələ Dərbəndli*

---

## ORENBURQDAN

Buxara əmiri bu səfər Yaltadan övdətində Orenburqa endiyi vaxt sentralnı qastinsaya «Dekadans» restoranından bir qaç rus qızları gətirdib zövqü səfa etmiş idi.

Sora şunlardan iki dənəsini Buxaraya dəvət etdiyi söyləndi. 14 apreldə məzkur restoranda artiskalıq edici Vera ilə Norka adlı iki qız Buxaraya getdiklərindən məz-

*Çox səfər etmək lazımdır. *(Red.–T.K.)*

kur xəbərin doğruluğunda şübhə qalmadı.

Sentralnı qastinsanın üç («Половой»)larına həm ay baxıcısı ilə əmir həzrətləri gümüş medallar vermişdir.

---

## DƏRD

Vallah, genə sözü aşkar söyləmək lazımdır, mətləbi gizlətməkdən fayda yoxdur. Qoy genə Molla Məsum çıxsın mənbərə və qətlimə fitva versin. Necə ki, bir ay bundan əvvəl mənbərdə moizə vaxtı deyib, deyib, ağzı köpüklənib və axırda huşu başından çıxandan sora mübarək ağzından da bu sözlər çıxıb:

«Bu təzələr bir gün olar ki, bəlayi-nagəhana rast gələrlər. Görürsən bir paraların axırı necə oldu? Odu Sibiriyaya təşrif aparırlar. Ay camaat, şəriət əldən getdi, qoymayın. İçinizdə olan təzələri öldürün. Hər nə günahı olsa mən qəbul edərəm, günahı yoxdur, savabı var. Qoymayın, öldürün, vurun, boğun, cırın, yırtın, parçalayın! Hər nə günahı var mənim boynuma (bir paraları güman edirlər ki, axund o gün dəli olmuşdu və hətta rəvayət edirlər ki, o gecə axundu həkimə göstərdilər və həkim deyib ki, axundun beyninə qurd düşüb).

Bəli, keçək mətləbə.

---

Onu demək istəyirdim ki, sözünü saxlayıb deməyən namərddir. Qorxunu mülahizə edib dərdi içəridə saxlamaq müsəlman arvadının sifətidir.

Dərdiməndi ki, konəd dərd-nihan pişi-təbib
Dərdi u bisəbəbi qabili-dərman nəşəvəd.*

Sözüm budur ki, Osmanlıya və İrana məşrutə veriləndən bu yana İstanbulda və Tehranda müsəlman övrətləri yavaş-yavaş başlayıblar çuvaldan eşiyə çıxardıb ətrafa tamaşa eləməyə. Bunların bir parası əlsiz-ayaqsız bacılarına kömək fikrinə düşüblər ki, onların aclarına çörək paylasınlar, dərssizlərini dərsə qoysunlar. Hətta Tehranda bacılarımız bir yerə cəm olub İranın borc məsələsinə qarışıblar və öz var-yoxlarını vətən yolunda fəda etməyə razı olublar.

Bəli, işlər öz yolu ilə gedirdi və heç danışıq-manışıq yox idi, çünki çuval öz yerində durmuşdu, bacılarımız ancaq çuvaldan başlarını çıxardıb bu işlərə məşğul olurdular. Yoxsa əgər, xudanəkərdə, bunların birisi cürət edib çuvaldan çölə çıxaydı, İstanbulda da olsa idi, daşqalaq edərdilər. Zarafat eləmə, qardaş, buna müsəlmançılıq deyərlər. Odur, Xivədə bir oğlan bir qıza aşiq olmaq ilə hər ikisini dar ağacından asıblar.

---

Axırda Kəsmayi gəldi çıxdı Tehrana və sərdar Mənsurun və Müizzissoltanın pulu ilə başladı «Vəqt» qəzetəsini çıxarmağa və haman qəzetənin 21-ci nömrəsində Molla Məsum kimi başladı camaata nəsihət eləməyə ki, bundan sora çuvaldan başlarını çıxardan övrətlərin başından vurub dübarə çuvala soxsunlar. İndi haman Kəsmayi deyir ki

«Rəfte rəft, əmma bərayi-bəd qəmxari konid»*

Yəni hərçənd övrətlərimiz bir qədər atılıb düşüb bizi möminlər içində biabru elədilər, amma bundan sora dəxi onlara fürsət verməyin. Aman günüdür, verməyin...

---

Kəsmayi – Gilanda bir kənddir. Bir vaxt hansı bir İran zalımı gəlib bu kəndi talan eləsin, biçarə rəiyyət yalvarıb ki, «sən Allah, barı uşaqlarımızın başını kəsmə». Kəndin adı o vədədən qalıb Kəsmayi.

İndi də cənab Kəsmayi, yəni «Vəqt» ruznaməsinin müdiri-möhtərəmi İran zalımının acığını Tehran övrətlərindən almaq istəyir.

---

Amma mən elə qanıram ki, burada acıq-zad yoxdur.

Biçarə belə başa düşür.

*Hərdəmxəyal*

---

## QƏZETƏLƏRDƏN

«Həqiqət», nömrə 72.

«Genə demək lazım ki, İrəvan əmvali-mövqufəsinin mütəvəllisi Mirhüseyn adlı, gödək boylu, sarı bənizli, seyrək saqqallı, zəif bünyəli bir rövzəxandır. İstedadsız, məlumatsız bir vücud olub nəinki yeddi min manatlıq mövqufatı idarə edəməz, bəlkə kəndi şəxsi ümuratından özgəyə möhtacdır».

Molla Nəsrəddin:

Cənabi M.Məsud heç ürəyini sıxmasın. Əgər yeddi min manatlıq mövqufatı Mirhüseyn ağa idarə eləməkdə acizdir, elədə biz onu çıxardıb yerinə ağayi-Molla Məhəmmədbağır ağanı təyin etdirərik. Boyu gödək deyil, uzundur, saqqalı sarı deyil, qaradır, zəif bünyəli olmağı barəsində də bir söz deyə bilmirik. Zira ki, ağanı bilmirəm, amma ildə bir övrət siğə edən mömin və müqəddəs bəndələr bir dəri bir sümük ola, ola genə həştad il yaşayırlar.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

---

*Həkim yanında dərdini gizlin saxlayan xəstənin dərdinin sağalmaması səbəbsiz deyil. *(Red.–T.K.)*

*Gedən getdi, amma sonrasının fikrini edin. *(Red.–T.K.)*

Məşrutə yaxşı şeydir

Bəli, bəli, əlbəttə

– Конституция – вещь хорошая.

– Да, да, конечно.

Məşrutə pis şeydir

Bəli, bəli, əlbəttə

Rotter

– Конституция – вешь плохая.

– Да, да, конечно.

12 cəmadiələvvəl 1328 **Beşimci il** 9 мая 1910 г.

# ملا نصرالدين

№18 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 18




Linoq. S.Bıxova

Борьба въ цирке бр. Никитиныхъ.

## ƏDƏBİYYAT
**(Bənzətmə)**

Sonya, ey dilbəri-pakizə əda,
Sənə bu Naqdı bəyin canı fəda.
Aşiq oldum o zamandan ki, sana
Hər nə hökm eylədin, ey mahliqa,
Etmədim onda təxəllüf əbəda
Diləyin oldu məramınca rəva.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!»

---

Sənəmim, lalərüxim! gülbədənim,
Mələyim, sərvqədim, simtənim,
Ay fərəhbəxş dili-pürmihənim,
Söylə, aya, günahım noldu mənim?..
Qarğalar məskəni oldu çəmənim,
Keçdi əğyar əlinə yasəmənim,
El bütün oldu bu gün tənəzənim.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---

Ta dedin tabei-fərman ol! Oldum.
Hüsnümə valehü heyran ol! Oldum.
Nazənin canıma qurban ol! Oldum.
Eşqdə xanəsi viran ol! Oldum.
Qapıma icz ilə dərban ol! Oldum.
Aqibət müstəhəqi-nan ol! Oldum.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---

Dil o gündən ki, düçar oldu sənə,
Bir yazıq aşiqi-zar oldu sənə,
Uydu, bisəbrü qərar oldu sənə,
Var-yoxu ta ki, nisar oldu sənə,
Bir də baxmaq mənə ar oldu sənə,
Başqa bir cəzbəli yar oldu sənə,
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---

Əmr qıldın mənə şeyda ol! Oldum.
Eşqdə bisərü pa ol! Oldum.
Yəni sərdadeyi-sevda ol! Oldum.
Tərki-namusa mühəyya ol! Oldum.
Şənini at çölə, rüsva ol! Oldum.
Nəzəri-xəlqdə ədna ol! Oldum.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---

Söylədin hörmətini at! Atdım.
Malını, sərvətini at! Atdım.
Əhlini, külfətini at! Atdım.
Qövmünü, millətini at! Atdım.
Cümlə heysiyyətini at! Atdım.
Müxtəsər, qeyrətini at! Atdım.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---

Mənə aid bütün irsi-pədərim:
Əkinim, mülküm, evim, bumü bərim
Nə zaman getdi isə, yox xəbərim.
Səndə idi mənim ancaq nəzərim,
Həp sənə oldu fəda simüzərim,
Qalmadı yanmağa bir parça tirim.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

---



Mənə əvvəlcə özün yar oldun,
«Sevdiyimsən» – deyə dildar oldun,
Məst ikən mən hələ, huşyar oldun,
Başqa bir fikrə həvəskar oldun,
Cümlə məəmləkimə nar oldun,
Məni yox etdin, özün var oldun.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

Leyk mən bunca fəlakətlə genə,
Varam əvvəlki sədaqətlə genə.
Durmuşam eyni iradətlə genə,
Baxıram kuyinə həsrətlə genə.
Mümkün olduqca bu halətlə genə
Sürərəm ömrümü qəflətlə genə.
Agəh olmam bu rəzalətlə genə,
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

Çünki biz taifə əhli-kərəmiz,
Mərəzi-eşqdə sabitqədəmiz.
Zadəganız, həpimiz möhtərəmiz,
Eşq meydanına yeksər həşəmiz
Dinü dildadeyi-zibasənəmiz,
İşbu vəch ilə səzayi-ədəmiz.
«Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın».

*(..........)*

---

## BU HƏFTƏ

– Bu həftə nələr olub?

– Bu həftə Ərəş mahalında bir molla bir kişi və bir övrətə nəzər siğəsi oxuyur ki, kişi övrəti aparsın Xorasana. Ziyarətdən qayıdandan sonra haman kişinin gözü düşür həmin övrətin qızına, Haman molla ki, iki ay bundan qabaq kişi ilə övrətə nəzər siğəsi oxumuşdu, indi də siğə oxuyub övrətin qızını verib haman məşədi kişiyə. Qız da çığır-bağır eləyir ki, «mən dayıma ərə getmirəm».

Söz yox, qız qələt eləyir.

***

– Bu həftə dəxi nə olub?

– Bu həftə Nuxada köhnəpərəstlər «Vətən» məktəbini dağıtmaq istəyiblər. Amma belə məsləhət biliblər ki, nahaq zəhmət çəkməsinlər, çünki mayın altısında quyruqlu ulduz onsuz da yeri dağıdacaq.

***

– Bu həftə dəxi nə olub?

– Bu həftə Peterburqda padşahlıq Dumada belə qərar qoyublar ki, müsəlmanlar cümə günləri dükanları bağlamasınlar, çünki bağlasalar, dəxi bazarda tut qurusu, qatıq və ciyər kababı tapılmaz və bazar əhli ac qalar. Bu səbəbdən Duma müsəlmanları borclu eləyir ki, xaçpərəstlər kimi bazar günləri dükanları bağlı saxlasınlar. Dumanın sırtıq üzvlərindən bir nəfər Sırtlanov küsüb və durub ayağa narazılıq göstərib və müsəlman yoldaşlarına təklif edib ki, Dumadan acıq eləyib çıxsınlar eşiyə. Müsəlmanlar çıxıb. Burada təəccüb eləməli bircə budur ki, bilmirəm, cənab Sırtlanov üçüncü Dumadan nə gözləyir.

Burası çox təəccüblüdür.

***

– Bu həftə dəxi nə olub?

– Bu həftə Buxaradan bizə yazırlar ki, Buxarada olan qarabağlılar bu il məhərrəmdə layiqli təziyə saxlayıb şaxsey dəstəsi tutmadılar. Əgər şaxsey dəstəsi tutsaydılar və buxaralılardan bir nəfər bikar adam gəlib şaxsey gedənlərə gülsəydi, o vaxt qarabağlılar da qeyzə gəlib dünyanı dağıdardılar, axırda sünnü-şiə davası çıxardı. Allah rast saldı ki, bir belə şey olmadı. Hərçənd bu il qəzetlərdə yazırdılar ki, bir belə dava əmələ gəlib, amma yalandır, ola bilməz.

***

– Bu həftə dəxi nələr olub?

– Dəxi canına sağlıq.

*Hərdəmxəyal*

---

## ZİYARƏT
**(Nuxudan)**

Mən: – Ay hacı, axır bizim hesabımız qaldı, çoxdandır sənin üzünü görməyirəm.

Hacı: – A balam, başım qarışıqdır, heç işlərimə çata bilməmişəm. Bir həftədir ki, ziyarətdə idim, bizim uşuqlar da naxoş idi. Uşaqları götürüb qurban olduğum Yusif Axund Papanətma, Şeyx Osman və Yel baba ziyarətlərinə getmişdim.

***

Mən: – A faytonçu, Yevlağa gedəsiyəm, sabah məni Yevlağa apar.

Faytonçu – Ağa, bu gün Babaratma ziyarətindən gəlmişəm. Atlarım yorğundur, sabah da Şeyx Osman ziyarətinə gedəcəyəm. Məndən olsa, bir-iki həftə dayan, fayton tapmayacaqsan. Çünki bu günlərdə ziyarətə gedənlər çoxdur.

**Naxçıvanda küküli Molla Fərəc.**




– А еще шейхульисламъ воспрещаетъ бракъ съ 8 – летними девочками: разве ей сейчасъ не пора выйти замуж?



***

Mən: – A kişi, bu qoyunu neçəyə deyirsən?

Qoyunçu: – Səkkiz manata.

– A kişi nə baha deyirsən? Yeddi manat verim?

Qoyunçu: – Baha deyil. Vallah, dünən, bu gün çox adamlar yeddi manata istəyiblər ziyarətə aparmağa, verməmişəm. Hələ o ziyarətdir. Gör nə var ki, verməmişəm.

***

Mən: – Dursunəli dayı, xoş gördük. Nə var, belə kefsiz, ağac ilə gəzirsən?

Dursunəli: – Balam, bir neçə gün əvvəl Yelbaba ziyarətinə getmişdik. Qayıdanda gördük Kiş çayında çoxlu su var. Fayton ilə çaydan keçəndə quyu var imiş. Fayton dönüb, töküldük suya. Məni zor ilə dartıb çıxartdılar, ayaqlarımı daş ağrıdıbdır.

***

Mən: – Həmid dayı, atını mənə neçəyə kirəyə verərsən? Günortaya kimi kəndə qurdlara və yarpaqlara baxıb gələcəyəm.

Həmid dayı: – Balam, atım əldə deyil. Bu gün üç gündür bizim qonşu Səlim minib ziyarətə getmişdi. Ata nə həng gəlibsə, daha at işə yaramayır.

*Dərdmənd*

## RƏSMİ ELAN

**Bakıda qız məktəbinin divarlarına bir belə elan yapışdırılıb:**

**«Məktəbdə oxuyan mütəəllimlərdən birisi evlərinə iznli gedəcəyi vaxt «növbətçi» müəllimə tərəfindən şiddətli surətdə bütün üst-başı və əşyası başdan-ayağa qədər axtarılacaqdır və axtarıldığına dair əlinə bilet veriləcəkdir və bu bilet ilə qapıdan buraxılacaq. Əgər biletsiz gedən olsa, qapıçı tərəfindən buraxılmayacaqdır».**

## TƏKFİRÇİLƏR

Gözlər aydın olsun, təkfir gücdən düşüb, təkfirçilərin sözlərinə inanan olmayır. Tiflis axundlarından biri üç ay müddəti ərzində nə qədər çalışdı, nə qədər vuruşdu, nə qədər özünü öldürdüsə, ancaq-ancaq bir nəfər Gəncəli, xasü xalis, müqəddəs və köhnə müridini inandıra bildi ki, Ərəszadə kafirdir.

O dəxi axundu Qurana qəsəm verməmiş inanmadı! Öz əlilə Quranı götürüb açdı axundun qabağında və dedi: səni and verirəm bu Qurana, doğrudanmı deyirsən ki, «Ərəszadə kafirdir», yoxsa mollaların qədimdən adətlərincə onun hörmət və nüfuzunu kəsib, öz nüfuzunu artırmaq istəyirsən?

Axund hər iki əlini Qurana çırpıb dedi: «Bu Qurana and olsun ki, yalan və böhtan demirəm, Ərəszadə kafirdir.

Bundan sora müqəddəs mürid inandı və o saat da götürüb əhvalatı Gəncə şəhərinə teleqrafən xəbər verdi. Məzə burasındadır ki, gəncəlilər də tez inanmadılar. Teleqrafın cavabında yazdılar ki, «necə ki, axund Qurana qəsəm etməmiş sən özün inanmadın, habelə biz də sən and içməyincə inana bilməyəcəyik».

Eşitdiyimizə görə müqəddəs mürid bu günlərdə Tiflisdə olan iş-gücünü buraxıb, məhz islamiyyətin tərvicindən ötrü Gəncəyə gedəcək ki, Qurana and içib gəncəliləri inandırsın ki, Ərəszadə kafirdir.

*Cırcırama*

---

## MƏSLƏHƏT

Bir qızım var altı-yeddi yaşında,
Əqli, huşu kaldır hələ başında,
İstəyir bir kaftar yetmiş yaşında,
Molla dayı, verimmi, ya verməyim?

***

Bu gün Qulam oğlu gəlibdir bura,
Mən yazığı lap gətirib zinhara.
Söylər qızın sat bir pula, dinara
Molla dayı, verimmi, ya verməyim?

***

On beşdədir Cavadın oğlu Əli,
O da istir alsın bizim Dilbəri.
Özü çaxır içən, həm də tiryəki
Molla dayı, verimmi, ya verməyim?

***

Mən deyirəm qoca olsa da, ağsaqqala verrəm, cavana vermənəm, qoy qoca olsun, dindar olsun, amma arvad qoymur.

---

## ARVAD MÜTRÜBÜ

Hicab mədənində, yəni müsəlman vilayətində, yəni Rəştdə arvad mütrüblərü ilə bağa kefə getmək istəyənlər gərək ciblərinə bir şüşə araq qoyub gəlsinlər. Bu şərtə əməl olunmasa, dəxi ağalar rəncidəxatir olmasınlar.

## MÖCÜZƏ

Qulaq ver, Molla, sənə möcüz nağıl eləyim. Bu gün Şərur uyezdində Qaratəpə dağında üç ov var imiş. Təpədən yola səmt yenirmişlər. Bunu ermənilər görürlər, bir neçə güllə atırlar, heç birisi dəymir, ovlar düzəlirlər yola. Düz Ərmi kəndindən oyana olan müsəlman kəndi Dizədə Mirsəlimin evinə gedirlər və həyətdə başlayırlar otlamağa. Otlayandan sora gediblər evdə olan taxçada yatıblar. İndi üç gündür ki, hər yandan ziyarətə gəlirlər. İstəyirsən sən də, necə ki, mömin, buyur.

*İmza: Mirzə Qulay*

*ELAN*

**Bakıda «Nicat» cəmiyyəti tərəfindən xəbər verilir ki, keçən il Bakıda olan «Nicat» cəmiyyəti, bir ayrı cəmiyyət idi, indiki «Nicat» cəmiyyəti bir özgə cəmiyyətdir. Hər kəsin ki, köhnə «Nicat» cəmiyyəti ilə bir işi var idi, ya bir haqq-hesabı var idi, getsin köhnə «Nicat»ı tapsın və hesablaşsın. Ancaq təzə «Nicat»ın köhnə «Nicat» işlərinə qarışmağa nə həvəsi var, nə bir mənfəəti var.**

**Köhnə «Nicat» ayrı, təzə «Nicat» ayrı.**

## MORQUL ŞİVƏSİ

Aləmi vurma bir-birə bəsdir, usan, a Mollacıq!
Gəlmiş əlindən təngə gör pirü cavan, a Mollacıq!
Şahü gəda, böyük-kiçik çəkir aman, a Mollacıq!

---

Bircə mən anlıyanmadım məqsədini, xəyalını,
Hansı ləindir sənin həram edib həlalını,
Mürdəşirə verim sənin mərifətü kəmalını
Jurnalını məzarda qoyum yanan*, a Mollacıq!
Xalqa olubdur hər sözü tirü kaman, a Mollacıq.

---

Sən elə bilmə ki, sənin sözün daşıbdı sel kimi,
Qulaqlara dəyib keçir davamı yoxdu yel kimi,
Çəkil kənarda otur, danışma, dinmə el kimi.
Nə açma göz, nə baxma heç o yan-bu yan, a Mollacıq!
Qoy eləsinlər bir-birin cırıq tuman, a Mollacıq!

---

Olub qalayçı, ay gözüm, qazanları qalaylama,
Avamı çapsa mollalar, işin nədir, haraylama!
Əlindən ağlayır sənin: nə hind, nə dalaylama,
Düşəndə yadına Tibet, çəkər fəğan, a Mollacıq!
Nə cismdə qalır təvan, nə ruhi-can, a Mollacıq.

---

Əgərçi səncə mollalar açıb dükani-şirkəti,
Satılla mövhumatlar, soyub yeyillə milləti.
Özün də molla qoymusan adın nədir, bəs illəti?
Başında kuhi-Qaftək bəyaz kətan, a Mollacıq!
Zibəs ki, çox ağır düşüb, şişib qafan, a Mollacıq!

---

Siz hamınız da ki, bu gün mollasız, ey avamlar,
Şivə ilə gəzib qurun xəlqə nihani damlar.
Kef çəkirik işin nədir behiştdə hac xümamlar,
Bizim kimi qoyunlara odur çoban, a Mollacıq!
Olar gər olmasa bizi yeyər qaban, a Mollacıq!
Gələndə nagəhan bəla qaçıb haman, a Mollacıq!
Açıb oxulla ayeyi- «Tükəzziban», a Mollacıq!

*Zansol*

---

## RƏDDİ-CAVAB

Molla Nəsrəddin keçən nömrədə bir şəkil çəkmişdi ki, müsəlmanlar teatra gedəndə ucuz bilet alıb bir pərdədən sora keçib əvvəlinci cərgədə otururlar.

Yaxşıdı ki, Qafqazda müsəlmanlar heç olmasa ucuz bilet alırlar, amma Rəştdə rəisi-maliyyə və mücahidi-əvvəl üç yüz manat məvacib ala-ala teatra gələndə, beş nökəri və iki yoldaşı ilə gəlib, bir qəpiklik də bilet almır.

---

## TELEQRAF

Rəştdən bizə belə xəbər verirlər ki, şeyxül-islamın qardaşı qonaqlıqda bir növcavan uşaq ilə balkonda gəzər ikən balkonun məhəccəri çürük olmağı səbəbindən ikisi də birdən yıxılıblar.

Əgər Rəştdə məccani mərizxana olmasaydı, Allah bilir ki, bunların dadına kim yetəcək idi.

---

## POÇTA QUTUSU

Gəncə uyezdində Qızılhacılıdan gələn qabaqkı məktub çap olunmayacaq. Səbəbi budur ki, hələ oxuyub başa çıxmamışıq.

***

Culfada «Müxbirimiz»ə: Molla Əhmədin hərəkətini yazmaq olmaz. Ayıbdır.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

---

*Yanına. *(Red.–T.K.)*




Qəzetlər xəbər verirlər ki, ğəriqlər fürsəti qənimət bilib Kridi oğurlamaq fikrinə düşüblər.
К кридскому вопросу.

19 cəmadiələvvəl 1328 **Beşimci il** 16 мая 1910 г.

# ملا نصرالدين

№19 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 19




Övrət (ərinə): İnsaf elə, neçə ildir ki, ayrı arvad alıb mənə də heç baxmırsan, bari məni boşa ki, azad olum, canım qurtarsın.

Ər (övrətə): Boşamanam, boşamanam. Qoy canın çıxsın. Xilafi-şər iş ki, görmürəm. İxtiyar məndədir, istərəm boşaram, istərəm ölənə kimi kəbin altında saxlaram.

## ƏDƏBİYYAT

Neçin məktəbə rəğbətim olmayır?
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Mənə hər qəzetçi bərəldir gözün,
Yazır hey qəztələrdə «məktəb» sözün
Sözün qoy deyim bir kərə lap düzün:
Bu işdən mənə bir qazanc olmayır,
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Oxur bunda hər kəs, qanar həqqini,
Qanan mütləq ali sanar həqqini.
Axund isə xəlqin danar həqqini,
Bununçün mənim rəğbətim olmayır,
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Mənə xeyrsiz olduğuyçün bu kar
Ona bağlaram küfr adını zinhar!
Camaat da duymuş bunu aşikar,
Bu işdən mənə bir qazanc olmayır,
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Və bir də bu məktəblilər, bilümum,
Oxurlar kamalınca ali ülum,
Edirlər bizə sora yeksər hücum.
Bununçün ona rəğbətim olmayır,
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Əgər məktəb əmrində bilintixab
Mənə tapşırılsa ümumən hesab,
Mən ol vəqt haşa edəm ictinab.
Fəqət indilik bir qazanc olmayır,
Cibim dolmayır, dolmayır, dolmayır!

—

Ax, ax... Ay keçən günlərim! Vay mənə!
Hər evdən gəlirdi neçə pay mənə:
Plov, halva, bal, yağ, şəkər, çay mənə.
Nə çarə ki, indi bular olmayır,
Qarın dolmayır, dolmayır, dolmayır!

—

Çətindir bizimçün bütün məsələ,
Bir ildə üç ehsan da keçmir ələ.
Belə qalsa iş, razı olluq hələ,
Bu da olmayır, olmayır, olmayır,
Qarın dolmayır, dolmayır, dolmayır!

—

Yığıncaqlar indi söz ilə ötür,
Beş-üç kəlmə söz söylənir, iş bitir.
Fəqət şənimiz günbəgündən itir,
Bizə ehtiram olmayır, olmayır,
Qarın dolmayır, dolmayır, dolmayır!

...........

---

## HACI İBRAHİMOV

«Rusiyada Əbdürrəşid İbrahimov həzrətlərini tanımayan kimsə yoxdur». Bu adamın barəsində Əhməd bəy Ağayev belə deyir və belə deyəndən sora başlayır hacının hünərlərini və xidmətlərini bir-bir saymağa. Məsələn, İstanbulda «Əsrari-Qasimi» elmlərini oxuyub qurtarandan sora gəldi Peterburqa və başladı «Ülfət» qəzetəsi çıxarmağa. Axırda baş götürüb getdi Yaponiyaya və orada 35 nəfər məbus və mühərrirlərdən və vəzirlərdən islam dininə çöndərdi. Elə az qalmışdı ki, Yaponiya imperatoru da isla-



mı qəbul edə ki, dəxi İbrahimov istixarə eləyib, artıq qala bilmədi və oradan düz Məkkəyə tərəf yola düşdü və «Tərcüman» qəzetəsini elə indiyədək təəccübdə qoydu ki, aya görəsən, İbrahimov yaponlarla hansı dildə danışırdı?! Çünki İbrahimov öz dilindən savayı bir qeyri dil bilmir, yaponlar da müsəlmanca bilmirlər.

---

Bunların heç birini mən hesaba qoymuram. Allah şahiddir ki, Əbdürrəşid İbrahimovu Rusiyada tanımayan yoxdur. Amma söz burasındadır ki, əgər sən elə belə deyib dursan, mən də deyərəm ki, İranda Şeyx Fəzlullahı da tanımayan yoxdur. Ya gərək sözünü geri götürəsən, ya da gərək mətləbi açasan; yoxsa İstanbulda təhsil tapmaq, sonra «Ülfət» qəzetəsi çıxartmaq və sora da «Bəyanül-həqq» qəzetəsinə müxbirlik eləmək artıq bir iş deyil.

Mömin qardaşlardan təvəqqe edirəm: bir dəqiqəliyə dünya işlərini nəzərdən salıb, fikirlərini versinlər keçəcəyə. Və yada salsınlar Rusiyanın əvvəlinci Duma məclisini ki, Qafqazdan Peterburqa bizim də bir neçə vəkillərimiz gedib orda bizim dərdlərimizi ortalığa qoyub danışırdılar və günlərin bir günü Dumada övrət məsələsi ortalığa qoyulur. Müsəlman məbuslarından bir nəfər müsəlman övrətləri üçün də müsavat tələb edir ki, kişilərlə övrətlərin hüququ bərabərləşsin.

Bu söhbəti eşidir «Ülfət» qəzetəsinin sahibi cənab Əbdürrəşid İbrahimov və eşidəntək götürüb qəzetəsində yazır ki, «Bakı vəkili cənab Əliyev Dumada xilafi-şər söz danışıb və övrət məsələsi barəsində belə və belə rəy verib. Gərək o vəkili müsəlman qaydasınca səngsar etmək».

«Ülfət» qəzetəsinin bir nüsxəsi gəlib çıxır Şamaxıya və həmin gün şəhər bir-birinə dəyir və Peterburqa teleqramlar çəkilir ki, «vəkilimiz danışan sözə biz razı deyilik; əgər sözünü geri götürməsə, şəhərə qayıdanda Girdman çayına basıb boğarıq».

Allah Şeyx Fəzlullahı salamat eləsin.

---

Budur haman Hacı Molla Əbdürrəşid İbrahimov və hər kəs mənim sözlərimə inanır, inansın, hər kəs inanmır, and olsun «Güllük» məscidindən dörd ədəd xalça oğurlayıb, Nuxaya aparanda tutulub Car qalasına göndərilən Molla Alışan əfəndinin kardon papağına ki, bu dediklərim başdan axıradək düz və doğrudur.

*Molla Nəsrəddin*

---

## İKİ HACI

Car mahalında Almalı kəndində iki hacı var: birinin adı Paşan, birinin adı Hacı Süleyman əfəndidir.

Almalı camaatından çox xahiş edirik ki, Hacı Paşan və Hacı Süleyman əfəndidən soruşsunlar görək, Həccə nə üçün getmişdilər?

Bunu soruşub idarəmizə hər kəs yazsa, bizi özünə borclu elər.

*Molla Nəsrəddin idarəsi tərəfindən*

---

## BÖHTAN

Axır vaxtlarda müsəlman qəzetələrində bir belə xəbər çıxdı ki, Vladiqafqazda Axund Molla İsmayıl Həsənzadə sirk sahibindən rüşvət alıb və izn verib ki, məscidin yavıqlığına sirk oyunu gətirsinlər. Söz buradadır ki, rus qanunlarına görə hər bir oyun-oyuncaq yeri ki, orada içki içilər və çalğı çalınar, gərək məsciddən və kəlisadan üç yüz arşından yavıq olmasın. Keçən ayın üçündə Nuxada bir nəfər rus məscidin yavıqlığında sirk dəstgahı qurmaq istəyirmiş, hökumət izn verməyəndə sirk sahibi cavab eləyib ki, pəs nə səbəbə. Vladiqafqazda sirk ilə məscidin arası əlli arşından da azdır və sirkdə qızlar oynayanda az qalır ki, məsciddə minbər üstündə molla özündən getsin (Bu kafər qızların bari siğə eləməyə bir yol tapılaydı). Xülasə...

Bu əhvlat qəzetələrdə intişar tapdıqda Hacı Molla İsmayıl elə xəyal elədi ki, sirk sahibindən rüşvət almağını və izn verməyini biz yazmışdıq vəhalonki oxucularımız şahiddir ki, indi əvvəlinci dəfədir ki, bu məsələni biz jurnalda danışırıq.

Odur ki, hacı axund da dörd nəfər adam təyin eləyib ki, Vladiqafqazda «Molla Nəsrəddin» jurnalını oxuyanı tutub öldürsünlər və müştərilərimizdən də bir neçə nəfər yazıb bizdən xahiş ediblər ki, bundan sora onların jurnalını «Balta» stansiyasına göndərək ki, gəlib xəlvətcə orada alıb oxusunlar ki, dəxi şəhərdə jurnal görsənməsin.

Allah insaf versin.

*Lağlağı*

---

## QARAÇI DİLƏYİ

Qaraçı tayfasının dünyada ən mühüm diləyi və öz balalarını qucaqlarına götürüb hər saat onlara təlqin etdikləri sözləri budur: «hapulara, hapulara, o gün olsun oğlum düşsün qapılara, qapılara». Bunlara nisbətən Almalı camaatının da dünya və mafihada əvvəlinci arzuları və balaca övladlarına hər ləhzə təlqin etdikləri sözlər budur:

İgid seçməz haram ilə həlalı,
Qarət ilə kəsb eləyər cəlalı.

*Sofi zənbil*

---



Kitabi-mötəbərdə yazılıb ki, bir gün Musa əleyhissəlam bəhri-ümmanın yanından keçib Tura münacata gedirdi. Dərya tərəfindən səda gəldi: Ya Musa, hara gedirsən? Musa dönüb gördü ki, dəryanın balıqları hamısı başlarını sudan dişarı çıxarıblar. Musa dedi: Ey Allahın heyvanları, nə istəyirsiniz? Balıqlar cavab verdilər: Ya Musa, neçə gün bundan qabaq buradan bir dəstə müsafir keçirdi. Müsafirdən birinin dişi ağrıyırdı, dişini çəkib atdı dəryaya və çünki haman şəxs binamaz idi, onun dişi dəryaya düşən vaxtdan dəryanın suyu zəhər olub və bizi həlak edir. Tura gedəndə Allahdan istixasə et, bizə rəhmi gəlsin.

Bu hədisi Naxçıvanda Şeyx cənabları rəvayət edibdir.




Bu uşkolda oxuyan müsəlman uşaqları qurban olsun sənə, mənim dilbərim.
Люблю тебя такъ, какъ обучающихся въ этой школе мусульманъ.

## ŞEYXÜLİSLAM

Mərizxana elə bir yerə deyirlər ki, orada naxoşlar müalicə olunur. Yevropada mərizxana çoxdur, amma İranda və müsəlman məmləkətlərində yoxdur və bunun da səbəbi var. Səbəbsiz dünyada heç bir şey yoxdur. Səbəbi odur ki, əcnəbilər naxoş olanda onlar mərizxanaya və təbibə möhtac olurlar, amma müsəlmanlar naxoş olanda çağırırlar cindar Seyid Bağırı. O da naxoşun qabağında bir tas qurur, içinə su tökür və bir yazılı kağız salır və üfürə-üfürə başlayır oxumağa: «Bağladım, bağladım, çıxın cinlər, şəyatinlər». Bu cindar işini tamam edir və pulunu alıb gedəndən sora Qışlaqlı cənab filosof Baxış daxil olur və əlini cibinə uzadıb dərmanlarını çıxarır və birbir naxoşun qabağına açıb başlayır təriflməyə: «Badzənc burya, quş üzümü, töxmi-xərdəl, inəbül-əqləb, cövzi-hindi, qaqleyi-kübar, qaqleyi-suğar və dörd dirhəm mülki-ərzəq. Bunları qarışdırıb naxoşa verəndən sora nə dərdi olsa, haman saat kəsəcək».

Budur mərizxana, budur müalicə, budur təbib. Yoxsa Yevropada bir böyük imarəti məəttəl eləyirlər və başdan-başa qravat düzürlər və dünyanın zəhərli və acı və murdar davalarını gətirib oraya yığırlar, çağırırlar binamaz həkimləri və naxoşları doldurub həftələr ilə, aylar ilə orada saxlayırlar ki, nə var, nə var «biz bu naxoşlara müalicə eləyirik». Əvvələn, canı çıxsın naxoşun, gər azarlıdır, getsin özünə dava-dərman tapsın, əgər mərizxana yaxşı zaddır, nə səbəbə Təbrizdə, Tehranda, İsfahanda yoxdur? Əgər yaxşı zaddır, nə səbəbə Nəcəfdə və Kərbəlada yoxdur? Müctəhidlərimizin varlığı ilə küçədə bir bisahib müsəlman düşüb vayıldayanda bir yer tapılmaz ki, biçarəni aparıb orada müftə müalicə eləyib yemək-içmək verələr? Hansı müctəhid bir belə savab işin dalıyca olub? Elə hey qüsl, qüsl, qüsl, heyz, heyz, heyz, nüfas, mütə, feyz, huri, savab, ibadət, axırda genə qüsl.

***

Şabanın 15-də Rəştdə mərizxananı açanda mən o vədə dedim ki: «Ay balam, özünüzü ələ salmayın, əvvəl bir siz xalqı başa salın, görək, bu mərizxana lazımlı bir şeydirmi, yoxsa yox». Mənim sözümə o vədə qulaq asan olmadı. Qulaq asmadılar, özləri də peşiman oldular, çünki cindarlarımızın və dua yazanlarımızın bərəkətindən heç kəs mərizxanaya meyl və rəğbət göstərmədi; heyətin üzvlərindən heç kəs üzvlük haqqını vermək istəmədi və hətta şeyxülislamın yanına gedib beş tümən üzvlük haqqını istəyəndə cavab verdi ki, «itilin, itilin, mən də Şuşa naibi deyiləm ki, gecə-gündüz keyflənəm və rəiyyətlərdən zornan aldığım pulları şəraba verəm (pinəçi Ağabaladan üzr istəyirik ki, naibin adını çəkdik), itilin, itilin! Sizin mərizxananız bizə lazım deyil!».

Bax, şeyxülislam belə olar, nəinki indiki Qafqaz şeyxülislamı kimi ki, oturub özünə iş axtarır ki, hə nə var, götür qazilərin hamısına kağız yaz. Hə nə yazım? Yaz ki, hər kənddə gərək bir məktəb açılsın.

A qardaş, hər kənddə də bir məktəb olar? Vallah, lap elə urus işinə oxşadı. Bir bax, gör, həyə bu yaxşı işdir, hansı müctəhid bir belə işə fitva verib? Əgər Fazili-Dərbəndi verib, hanı Dərbənddə məktəblər? Əgər ağayi Şirazi verib – hanı Şirazda məktəblər? Qüsl, qüsl, heyz, heyz, siğə, siğə, məhərrəm, savab; huri, qılman, axırda genə qüsl. Axırda genə qüsl.

Mən ölüm, ürəyini sıxma.

*«Dəli»*

---

## FELYETON

**(15-ci nömrədən mabəd)**

Və haman günün sabahı sübh tezdən Sallax Mikayıl biçarə vəfat eləyir, erkəndən gedirlər Rəsul əfəndiyə xəbər verməyə. Nəfsinə qurban olduğum bir az nəqahəti olmağa binaən kandidatını tövsiyə edir və onun da kəsaləti olmaq münasibəti ilə (sup) kandidatını tövsiyə edir və onun da ətaləti olmaq münasibətilə (borş) kanditatını tövsiyə edir və onun da kəsafəti olmaq münasibətilə (bozbaş) kanditatını tövsiyə edir. Və bu, bu minval ilə günorta olur, amma molladan heç bir əsər yox. Zavallı Sallax Mikayıl da qaçır idi. O vədə lotular məsum və məzlum mollaların başına bu fırıldağı çevirdilər. Məgər deməzsən ki, mərhumun (ölülük, dirilik) əlli manat pulu çıxıbdır. Bunu eşidən əməleyi-mövta bir rədi-bərq kimi hərəkətə gəlib quzğun kimi (laşiyə) tərəf şitaban oldular və cümləsi də bir ağızdan: «Allah qəriqi-rəhmət eləsin! Mərhumü məğfur çox yığınlı və dərinli adam idi». Xülaseyi-kəlam lotular ikinci pərdəni bu gunə oynayırlar və Rəsul əfəndiyə xitabən söyləyirlər: «Əfəndi, usta! Vaxt gec olmaq münasibətilə mərhumun bir para təchizi-təkfini, yəni (cövzi, iskati), (manatlıq əşəri), (zərbəfti), (təftəni), (çiti), (ağı) və əmsalı kimi şeylərin təqsimini qəbristanlıqda olmaqlığını münasib gördük. Qisseyi-axir, bu tövr ilə zavallı Sallax Mikayıl dayını bər fövci-əməleyi-mövta, qüssal, rəmmal, kankançı (birdəfəlik deyinən həşərat) çox bir cəlal ilə götürüb məhəlli-məqsudinə yetirirlər. Əməleyi-mövtadan məşhur massajist Molla Abbas məsələni kəşf eləyir. Xülaseyi-kəlam, biçarə məzarçı da işdən hali olub başlayır sual eləməyə: «Həzərat, zəhmət çəkin qəbrə baxın. Vaxt dardır, tamam eləyək, gedək». Bu əsnada oxuduğuna qurban olduğum Rəsul əfəndi yerindən qımıldayıb deyir: «Diqqət haramdır, hərəkət eləyin, tamam eləyin gedək». Bu əsnada Əhməd ağa əfəndiyə xitabən dedi: «Usta, bir dik daş tamam zavallının belinin ortasına düşdüyü kimi bir şiş daş da düz biçarənin qulağının dibinə düşür. Bu əsnada nəfsinə qurban olduğum Hacı Abdulla əfəndi söylədi: «Müctəhidlər bu barədə iştirak ediblər, yəni mövtanı saxlamaq məzmumdur, ona

binaən nə qədər tez olsa, savabdır zənn edirəm». İnsafına qurban olduğum Əhməd əfəndi oturduğu yerdən buyurdu «Üləmayi-kiram bu barədə müttəfiqül-rəydirlər, yəni mərhumu intizarda qoymaq caiz deyil». Ona binaən mərhumu tənək burması kimi eşib ikiqat qəbrə tıxırlar. Böyləcə mərhumü məğfuru fələyin çənbərindən keçirillər. Cəvizi, isqati, təftəni, zərbəfti, çiti, ağı, çahar guşəni, kökүs duasını, manatlıq əşəri, gec olmağa binaən, ən axır vaxta təəllüq edirlər və əl boyda olan, yəni füqəraya məxsus təlqini oxuyub işə nəhayət verirlər. Və məlum ola ki, təlqin oxunan zaman nəinki qəbristanın yanındakı öküzlər, inəklər və o civardakı xoruzlar, hətta mən, dəli Əhmədağa banı başında ola-ola eşitmədim desəm, xəta etməmiş oluram. İştə hürriyyət, ədalət, müsavat, üxüvvət.

Fi 4 mahi-may 1910 sənə.

*Mabədi yoxdu*

---

## ŞAMAXI

Cənab Molla! Şamaxılılara müjdə vermişdiniz. Bəli! Siz deyən kimi də olur. Cənab Seyid Ağa gəldi və işə başladı. Birinci məclis başmaq və çəkmə məsələsi oldu. Müzakirə ən başda bir müəllimdən başlandı ki, bu müəllimi ağa çəkməli görmüşdü. Bu müəllim də təzə açılan məktəbi-cədid müəllimlərindəndir. Hələ müzakirə və istintaq qurtarmır və bəlkə hələ çox uzun sürəcək. Çünki ağa tərəfindən çəkmə geymək qadağan, ancaq təzə açılmış məktəb idarəsi ümum şagirdanə elan olunmuş ki, bir aya kimi məktəbdə başmaq adı qalmasın.

Bir-birinə zidd bu iki məsələ xeyli müşkül göründü. İş hansı tərəfə yatacaq, hələ məlum deyil.

---

## SƏYAHƏT

Gəncə uyezdində olan Qızılhacılı kəndinə bir neçə dəfə səyahət etmişəm. Bir səyahətimdə bunu gördüm: Qızılhacılı qoca kişiləri 18 min manat verib tikdirdikləri məscidə yığılıb danışırlar ki, təzə açılan məktəbi qapasınlar. Çünki onların uşaqlarına məscid qırağında iranlı deyən dərslər kifayət edər.

İkinci səyahətimdə gördüm: məhərrəmül-həramda ağlamağa gələn adamların başmaqları oğurlanıb və mollalar camaatdan çox pullar yığıb əkiliblər. Amma işqolda balaca uşaqlar kitab-dəftərsiz, qələm-mürəkkəbsiz oturublar. Və axırıncı səyahətimdə bunu gördüm: lələ köçüb yurdu durur. Camaat köçüb, işqol dağılıb, uçitel təkcə oturur. Soruşdum belə niyə? Dedi: bilirsən müsəlman işidir.

*İmza: Yolçu*

---

## PULLAR

Cənabi-müstətab və müqəddəsülqab, məsələn, alimül-mövhumat, sahibül-mövzuat və raqibül-mövqufat və kaşiful-məyubat Molla Nəsrəddin əmi hüzuri-alilərinə: Əfəndim, bu gün burada sizin molla olub, ya olmadığınız üçün böyük bir ictima və mübahisə olundu. Camaatın qismi-cüzisi mollalığınıza iqrar və qismi-küllisi inkarda olub, nəhayət nə başını ağrıdım, qərar buna qoyuldu ki, bir qaç məsələ sual olunsun. Hərgah cavab verəsiniz, ümumən sizi təsdiq və illa cəmən sizi təkzib etsinlər... Amma, Molla, gərək cavablarınız dəlil və bürhanlar ilə olsun.

İştə məsələlər və suallar:

1. S: O hansı yalanlardır ki, Əimeyi-əthar haqqında söylənsə savabdır, lakin sair insanlar haqqında günahdır?

2. S: O hansı oyundur və yaxud şəbihdir ki, məscidlərdə, camelərdə səhneyi-tamaşaya qoyulsa, savabdır, fəqət teatrlarda səhneyi-tamaşaya qoyulsa, günahdır?..

3. S: O hansı çalğı, yaxud muzikdir ki, təziyələrdə çalanda savabdır, vəli toylarda, teatrlarda günahdır?

4. S: Təziyələrdə çalğı ilə alınan pullar, camelərdə, aşuralarda şəbih ilə yığılan pullar və Əimeyi-əthar haqqında yalan ilə cəm olunan pullarmı halaldır, yainki bunlardan qeyri yerlərdə qeyri xüsusda çalğı çalmaq ilə, teatr göstərib oynamaq ilə alınan pullar halaldır?..

Cavabınıza müntəzirəm.

*İmza: Müntəzir*

---

## BƏY

Adam olan özünü öyməz. Amma mən gərək öz barəmdə bir neçə söz deyim, çünki ha baxıram, mənim hünərlərimi heç dilə gətirib danışan yoxdur. Əvvələn, məlum olsun ki, mən təsdiq bəyəm, o biri bəylər kimi də deyiləm. Mən şalvarımın qırağına qırmızı tutub papağımın qabağına kakard da taxa bilərəm. İkinci, mən igidəm, saf yaxşı igidəm. Çox işlər görmüşəm, hamısını desəm, uzun olar. Nə ola, uzun qış gecələrində mənim yanımda olasan, buxarını yandıraq, oturaq, mən hünərlərimdən, vurduğumdan, çapdığımdan, kəsdiyimdən danışım, sənin ağzın açıla qala. Bu saatın özündə də heç kəs mənim qabağıma çöp sala bilməz. Üçüncü, mənim millətə də çox xeyrim dəyib, müsəlman qardaşları həmişə irəli aparmağa səy eləyirəm, köhnə evlərin çoxunu yıxıb viran eləmişəm ki, yerində təzə forma imarətlər tiksinlər. Çoxunun qoyununu və malını satdırmışam ki, çobanlığı buraxıb gedib çərçilik eləsin. Qərəz, mənim hünərlərim yazmaq ilə qurtarmaz. Hələ bu qədər bəsdir, sora genə yazaram.

*İmza: Təsdiq bəy*

Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə




– Susuzsan, əzizim, onunçün əmələ gəlmirsən.
– Паливать, паливать надо.

Əsrimizdəki iranlı.
Соврем. персиянинъ.

Литог. С.Быхова

# ملا نصرالدين

**№20 Qiyməti 12 qəpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 20**





Dövlət duması: Bağla, bağla dükanını. Litoq. S.Bıxova

Müsəlman dükançısı: Ay canım, niyə məni dükanımdan çıxarırsan, yoxsa istəyirsən ki, mən də o piyan urus kimi gedim girim şərabxanaya?!

## ƏDƏBİYYAT

## MƏNİM SEVDİYİM

Bir gözəl insandı mənim sevdiyim,
Cismimə bir candı mənim sevdiyim.

—

İl uzunu dərdini çəkməkdəyəm,
Aylar ilə göz yaşı tökməkdəyəm,
Aşiqiyəm, boynumu bükməkdəyəm,
Dərdimə dərmandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Bığları sünbül, yanağı lalədir,
Telləri qırxıq, qabağı malədir,
Saqqalı kül, fırtılığı jalədir,
Peysəri qalxandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Qaşı oraqdır, başı çəprəngədir,
Kirpiyi oxdur, səsi bir dəngədir.
Ağzı çərək, burnu da girvəngədir,
Rəngi badımcandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Qarnı xaşal, qurşağı örkən kimi,
Gözləri göy, sinəsi xirmən kimi,
Həm uzunu, həm eni Bəhmən kimi,
Rüstəmi-dastandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Məşhədi, molla, hacı naqqaldır,
Molla Nəbi, Beyzeyi-Dəccaldır,
Qəlbi qara, qırmızısaqqaldır,
Quli-biyabandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Həsrətini yarımın alman çəkir,
Rus, italyan, hərə bir yan çəkir,
Şah belə, soltan belə, bəy, xan çəkir,
Hər baxışı qandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Hind, Buxaradadır, Əfqandadır,
Çinü Kiridü həbəşistandadır,
Fasda, hər yandadır, İrandadır,
Kəbla Süleymandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Bir malades versən evindən çıxar,
Bir «prixod» alsa dinindən çıxar,
Bircə manata vətənindən çıxar,
Molladı, bəy, xandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

—

Özgələrə millətini basdırar,
Gənc həvəskarların asdırar,
Özlərini özləri qan qusdurar,
Dininə düşmandı mənim sevdiyim,
Qanına qəltandı mənim sevdiyim.
Nütfeyi-şeytandı mənim sevdiyim!
Bir sürü heyvandı mənim sevdiyim,
Bir gözəl insandı mənim sevdiyim.

*Məşədi Sijimqulu*







## VƏRASƏT HÜQUQU

Qədim əyyamdan Rusiyada bir şəxs vəfat edəndən sora varının on dörddən birini bacı aparırdı, qalanı tamam qardaşa yetişərdi. Rusiyanın ədliyyə nəzarəti tərəfindən bir zakon layihəsi dumaya verilib və bu layihədə qardaş ilə bacının hissləri bərabər yazılıb.

---

Buna kim nə deyə bilər? İştə ədalət, müsavat. Dəxi sözün nədir?

Amma yox, biz müsəlmanıq, bizim alnımıza bərabərçilik yazılmayıb, bizlərdə hər bir kəsə ixtiyar vermək olar, savayı övrətdən və qızdan. Qoy dövlət Duması nə eləyir eləsin, işim yoxdur, amma övrət sözü danışmasın, hər kəsin halına və gününə ağlayır, ağlasın, amma övrəti və qızı rahat qoysun, yoxsa dünyanı dağıdaram.

---

«Tərcüman» Dumanın və ədliyyə vəzirinin bərk üstünə hirslənib. «Pa, belə də iş olar?

Bu işə zaman və insan nəzərilə baxdığımız surətdə müsavata bir söz söyləmək istəmiriz» ... Amma çox da ki, zamanca və müsavatca bu iş yaxşı bir işdir, bəs bunu unudursan ki, biz müsəlmanıq, bizə belə müsavatlar yaraşmaz. Biz zaman-zad bilmənik. Bizim yanımızda övrət hüququ danışanın qarnını yırtarıq.

---

## HURİ

Surəte-suale-əhaliye-Torşiz və dəstxətte həzrətemüstətabe hoccətol-islam vəl-muslimin ayətullah fil-aləmin ağayi-Axund Molla Məhəmmədkazim Xorasani mədd zilləhul ali.

Hoccətol-islama dər in əvan ke douləte-aliyyeyi-İran cəhəte-sədde-suğur və tənzime umure-kişvəri və ləşkəri və təmini-bilad və islahe omurei molki və milləti, mohtac be vəchi şodə əst və ələt təhqiq qərz əz dovəli-xarice moucube muxatirati-əzimə əst və hər hiç aqil və zişuuri in məsəle puşide nist çenan ke əhaliye-məmləkəti-İran be teybe-xatire-biəndaze bexahənd ianəti bedəouləte-mətbueye-xud konənd. Aya dər in ianət əlavə bər niknami və hefz və şərəfo vətənxahi əcre uxrəvi həm xahənd daşt və indallah və indəl rəsul məcor və məsab xahənd bud ya xeyir və müstəidi anke dər sədri-ərizə mərqum və bexətte xatəmi-mobərək mozəyyən fərmayənd ziyade cəsarət əst.

Həştome şəhre rəbiəs-sani səneye-1326 eyne dəstxətte-mobarək.

Bismillahir-rəhmanir-rəhim.

Əlbəttə ianət becəhəte hefz nəmudəns-millət və dövlətra əz moxatirate-əzime mücahide beanvələst. İnşaallah təala səvab və əcre-mücahidinra xahənd daşt və inşaallah təala kutah nə xahənd nəmud.

Həqir əl-əhqər əlcani Məhəmmədkazim əl-Xorasani ruzname ye «Nəcəf».

---

## MƏNASI

Turşiz əhalisi müctəhiddən soruşur ki, indiki vaxtda ki, məmləkətimiz ianəyə möhtacdır, biz, yəni İran əhalisi eləyə bilərik ki, hökumətimizə lazım olan məbləği cəm edək ki, əcnəbilərdən borc götürməyə hökumətimiz möhtac olmasın. Ancaq bir şey qabağımızı kəsib: Bilmirik bir belə işin bizə axirətdə əcri veriləcək, ya yox. Əgər bilsək ki, veriləcək, vətənə kömək elərik, əgər verilməyəcək, dəxi dəli deyilik ki.

---

## CAVAB

Həzrəti-müstətab ağayi-axund Xorasani cavab verir ki: «Bəli, vətənə pul verənə axirətdə əcr veriləcək».

Söz yox ki, belə bir millətin vətənini axırda gəlib təqsim edəcəklər.

---

## MÜCTƏHİD

Tehranda bir zorba müctəhid var, adı Seyid Abdulladır. Bu ağanın barəsində mən bir neçə söz deyəcəyəm, siz də qulaq verin, ondan sora hər kəs bu ağaya rəhmət oxuyacaq, oxusun, nə oxuyacaq, oxusun, mən də amin deyəcəyəm.

***

Seyid Abdulla müctəhidin oğlu mövqufə mülkü təsərrüf edib mütəvəllisinə geri vermək istəmirmiş. Ədliyyə hökm eləmişdi ki, geri versin. O günlərdə də ittifaq belə düşdü ki, imam Cüməni bir övrətin şikayətinə görə ədliyyəyə istədilər və imam Cümə də mollaların çoxunu vasitə salıb ədliyyənin bu əhzarını xilafi-şər adlandırdı. Seyid Abdulla da acığnan naibüs-səltənəni və süpehdar rəisül-vüzəranı vadar etdi ki, divanxanayi-ədliyyəni (müvəqqətən) tətil etdirsinlər.

***

Keçmiş vaxtlarda bir Allah bəndəsini uzaqdan göstərib deyərdilər: «Gör necə fağırdır. Deyəsən müctəhiddi».

Amma indi İranda da bir abırlı mollaya müctəhid deyəndə elə rəncidə olur ki, deyəsən atasına yaman dedin.

*Zəli*

---




Təzə hakimin Tehrandan Rəştə vürudu.

## BƏHRİ-TƏVİL

Sevirəm mən səni ey simbədən, qönçədəhan, ey güli-xəndan. Müddətdi ki, eşqin odu sineyi-məcruhdə bir şöleyi-tabəndə kimi yanmağa başlıb. Gözəlim, tanrı bilir, kim, səni görcək ürəyim qana dönür, qəlbi-həzinim döyünür, çeşmim olur tar. Çoxdandı məni hicrin edib xəstəvü bimar. İnsafa gəl, ey rəhmsiz, öldürmə məni, navəki-müjgan ilə tökmə qanımı qapına, ey şuxi-sitəmkar. Axır nolu, gör rəhmə gəlib bu dili-məhzunumu bir şad edəsən? Qəlbimi abad edəsən? Əbdini azad edəsən? Ey büti-rəna, sənsizdi günüm tar. Hərçənd ki, cayiz olamaz şəri-pəyənbərdə ləvatə, vəli racedi bu mətləb cocuğum, hifzi-həyata. Məni tuş eyləyəcək firqətin ey şux məmatə. Məni mehman elə ol pəl ləbindən bir-iki həbbi-nəbatə. Dəxi məyus qapından sürümə ey kəməri misli-xəyyatə! Nə rəvadır (ürəyim tək) o qara gözlərə, gül çöhrəyə həsrət qalıban şamü səhər naləvü əfqan eləyim, qəlbimi büryan eləyim, didəmi giryan eləyim, ey məhi-taban. Dəxi bəsdir, bu qədər zülm yaraşmaz sənə ey bədri-dirəxşan. Sənə bu Şeyx Əli qurban! Görürsən ki, hamı mollaya ehsan eləyir, ey gözəl oğlan. Nə olar? Sən də mənə etgilən ehsan. Dəxi heç xof eləmə! Gər duya bir kimsə bu sirri. Çıxaram minbərə dər məhzəri-icmai-müsəlman. Deyərəm hərzəvü hədyan. Edərəm nəql ərəblə dəvənin nəqlini balənəti-şeytan. Tanıyırlar məni bu Xançoban əhli hamı əzpirü cəvan, ermənivü rus, müsəlman. Bu işi faş edəni eyləyərəm qanına qəltan. Bilməyirsənmi adı molla olan şərə təcavüz eləməz ey şəhi-xuban? Nə bir iş görəsən o iş şərdə caiz olacaq. Ey qədi-rəna, kimin var belə bir cürəti-güftar desin kim: «bu xilaf işdi, bunu görmə, a Molla!». Deyə kim böylə sözü, boynuna zəncir salıb, ayeyi-təkfiri onun şəninə nazil edərik, ta ki, ola özgəyə ibrət. Bizik mənbəyi-qeyrət, bizim əsli-həqiqət, bizə tabedi şəriət, neçə illərdi ki, zəhmət çəkibən mərsiyəxanlıqla bu gün şeyx adı təhsil eylədim. İştə həqiqət. Hamı şahiddi bu əmrə ki, bizim nəslimiz əvvəldən ila axirə tək şeyx, inanmazsan əzizim, gözün aç, bax gör özüm şeyx, atam şeyx, babam şeyx, nəsl bütün şeyx. Yəqin eylə ki, şeyx adına irad edəməz mərd müsəlman.

*İmza: Aşiqi-biqərar*



## VƏLVƏLƏ

Bir də gördüm ki, bazarda bir böyük vəlvələ qopdu. Camaat doluşub bir kişinin başına. Elə bildi ki, yazıq kişi qəflətən naxoş olub, yeridim camaatın içinə və gördüm ki, Kərbəlayı Muxtar oturub bir daşın üstündə və ağzı köpüklü əl qolunu ata-ata acıqlı danışır. Kərbəlayı Muxtarın dediyi sözlər bu idi:

– Ay müsəlman qardaşlar, vallah sizin xəbəriniz yoxdur ki, bu təzə açılan məktəbdi nə zəhrimardı, bizim uşaqları avara qoyacaq, uşaqların evini yıxacaq. Bir bax qulaq verin: mən yazıq yeddi yaşında öz uşağımı və səkkiz yaşında qardaşımın uşağını aparıb vermişdim məktəbə. Dünən axşam uşaqları çağırdım gör nə cavab verdilər: «Ata hələ nə yazı yazmışıq, nə bir şey oxumuşuq, hələ adları sayırıq». «Adə necə adlar?»

«Bəli, ata, evdəki, bazardakı bizim pişiyin, toyuğun, inəyin adını, quşları, xörəkləri, meyvələri, sağ və sol əlimizi, qulaq, göz, qələm, kağız, daha nələr, daha nələr».

Doğrusu, uşaqların sözünə inanmadım, özüm getdim məktəbə, nə gördüm? Dedikləri kimi, əlli uşağı doldurublar bir evə, boş-boş sözlər ilə uşaqları on beş gündür ki, avara qoyurlar. Hələ deyirlər, on beş gün daha belə oxuyacaqlar. Sağ olsun Molla Kazımın məktəbi. Əgər orada olsaydılar, indi əlifbanı tamam eləmişdilər. Bu nə məktəbdir? Oxut tez əlifbanı, başlat tez Quranı.

*İmza: Kərbəlayi Muxtar Şamaxılı*

---

## TELEQRAF

**(Xüsusi müxbirlərimizdən)**

Odes:

Bu gün Mədəlinin yövmi-mənhusu olmaq münasibətilə ümum fahişəxana və ümumxana və o misilli yerlər, məsələn, Balay kristal Konkordiya, Zerkalnı zal, Palermo, Kitayski dvores, Umun, Korş, Buf, Okvarum, Ermitaj, Yar, İstrelna və i. rəngarəng fanar və baydaqlar ilə donadılıb, axşamları da məşhur fahişəxanaların müxtəlif cəhətlərindən fişənglər əndaxt olunub çox mütəntən çırağban oldu və məşhur millətfüruş mütə müəllimi və zövci-axər mübəlliği və mətbuat səyyadı, surətən insan, xilqətən heyvan İsmayıl tərəfindən bir ayini-ruhani icra olundu. İslam aləminin hər bir tərəfindən təbrik teleqrafları gəldi və burada cümləsinin zəbti mümkün olmadığından zübdələrinin dərcini burada münasib gördük.

Yekatrinodar

Ərəs çayı aşdı, daşdı,
Vəliəhdi götdi qaşdı.

Qardaşları qızıl başdı,
Apardı sellər Mirzəni,
Top qara birçək Mirzəni.

*İmza: Rəhim xan*

---

BUXARA

Ərəs çayı oda gəlir,
Rus qoyunu suda gəlir,

Apardı sellər maralı,
Biçarə başı bəlalı.

*İmza: Əbdüləhəd xan*

---

SALANİK

Pəncərədən gördüm ayı,
Gözəllikdə yoxdu tayı.
Urus qəndi, İran çayı,
Apardı sellər yabanı,
Həmidtək vəhşi qabanı.

*İmza: Əbdülhəmidxan*

---

Və axşam başda Səyyadi-Qulam sənəm (?) və Səyyadi-qəzetə və jurnal (?) olduğu halda ümum arfiyanka, şansanetka və prastitutka – cümləsi yekavaz olaraq oxunan milli təranənin lətafətinə görə burada qareini-giramı mütələzziz və feyziab eləməyi vəzifədənədd etdik.

MİLLİ ƏDƏBİYYAT(?)...
XOR...

Odesin bərabəri Rəşt, İsfahan da deyil,
Şam, Salmas, Marağa, Təbrizü Tehran da deyil,
Gəncə, Şirvan, Qarabağ, Dərbənd, Həştərxan da deyil,
Vyana, Berlin, Parij, Bern, Afstran da deyil,
Səbzəvar, Nişabur, Hindistan da deyil,
Yığılsa İran, Turan, olmaz yamağı Odesin.

Al-əlvan rəngə dönən sərvi-xuramanlara bax!
Naza bax, qəmzəyə bax, işveyi-çamxamlara bax!
Mala bax, qiymətə bax, ən sora «karman»lara bax!
Görürsə Əhəd, Həmid, olurlar heyranı Odesin.

---

**«NİCAT» CƏMİYYƏTİ**

6 mayda cəm oldular cəmi üzvlər

Sədr: Qaspoda, «Nicat» prosvetitelniaya obşestvonun çlenlərinin uçotu zakon ilə düzdü. Bir az sükut edin, lazımdı predsedatel seçmək.

Kərbəlayı Mahmud: – Xeyr, sizin canınız üçün, ne moqu, zanyat.

– Xoroşo, taqda özgəsini seçək.

Qışqırıq düşür: – «Hüseynqulu olsun».

Hüseynqulu: – Belə tatarski bilmirəm, yoxsa oçen rad.

Sədr: – Qaspoda, tak nelzya. Bir adam seçin qurtarsın, vaxt azdır.

Bəli, Hüseynqulu sədr oldu.

Sekretar: – Şeyxülislamdan gələn kağızdan belə məlum olur ki, cənab şeyx xahiş edir ki, darülmollayan açılsın, çünki kəndlərin çoxu mollalara həsrət qalıbdır. Nə mərsiyə deyən var, nə ölü basdıran. Sekretar bu kağızı qurtaran kimi hamı bir-birinin üzünə baxdılar: «Yarəb, bu nə oxudu». Müəllimlərdən biri təvəqqə elədi ki, yaxşı olardı perevod edəydilər.

Sədr: – Vopros isçerpan.

İnjener: Hərçənd vopros isperçan, proşu slova.

Sədr: – Buyur.

İnjener: – Kəndlərdə mollalar nə iş görəcəklər, pomoylmu nado расследоват.

Axır dedilər ki, vopros isçerpan?

Vopros isçerpan, vopros isçerpan.

*Dəmdəmək*

---

**Ağdaş 11 may 1910**

Rəfi-iştibah.

Özüm bir mömin Allah bəndəsi, hacı kişiyəm. Beş vaxt namazı məsciddə imam ilə qılıram. Heç bir kəslə, ya müəllimlə ədavətim olan deyil. Qeybət bilmərəm, yalan söyləmərəm, məktəb işinə qarışmaram və məktəb bağlanmağından ötrü cürbəcür fitnəvü fəsad çıxaran deyiləm. Bununla ümum Ağdaş camaatına elan edirəm ki, əgər mənim barəmdə bu cür işlərdə suiniyyətləri var isə, cümləsi batildir.

*Hacı V.ov.*

---

**İRAN İŞLƏRİ**

«Voss Zeit» qəzetəsinə İngiltərədən çəkilən teleqraf xəbəri rəvayət edir ki, İran məsələsi Yevropa hökumətlərinin bir-birinə toqquşmağına bais ola bilər. Çünki Rusiya və ingilis hökumətləri İrana izn vermirlər ki, bu iki millətlərdən başqa sair kəslərə dəmir yol icazəsi versin.

Məsələnin həllini Yevropa hökumətləri əmiri-Buxaraya mühəvvəl eləyiblər. Əmir həzrətləri də İran politikasına müdaxilə etməyi müzayiqə eləməyib. Lakin qəti cavabını İranın cavan şahı ilə görüşməyinə qoyubdur. Buna görə Tehranda məclisi-milli riza göstərməyib; çünki on yaşında şahın Buxara əmiri ilə görüşüb danışmağını məsləhət bilməyib.

Hələ görək axırı necə olacaq.

*Julik*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

Yunanıstan

Krid

Krid

Rotter

Arnaudlar Kridin Osmanlıdan getməyini eşitcək başladılar ağlamağa.

3 cəmadiəlaxir 1328 **Beşimci il** 30 мая 1910 г.

ملا نصر الدين

**№21 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 21**

**Təbrizdə Naqqalülislam**



**O.Şlinq**

– Hələ mən bilmirəm ki, bu ikibarmaq börklülər Firəngistandan gəlib bizdən nə istəyirlər?!

– Что хотятъ от насъ эти съ шапочками в два пальца?!

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

## QAÇ AT BASDI

Qaç, oğlan, qaç! At basdı! Millət gəlir,
Ötüşdən çıxan bir camaat gəlir,
Edib cümlə əqvamə sibqət gəlir,
Verib hər kəsə dərsi-ibrət, gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Çəkil! Yol ver! At bağrı çatlatmışıq,
Vurub-yıxmışıq, tutmuşuq, atmışıq,
Çapıb qovmuşuq, qan-tərə batmışıq,
Yığıb milləti bir yerə qatmışıq
Müsavat, ədalət, üxüvvət gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Neçə əsrdir, indi bilehtimam
Qoyub nami-milliyyətə ehtiram,
Qoçaq əlləşib, çarpışıb sübhü şam,
Xüsusən, bu sonu beş ildə təmam
Edib aləmə bəxşi-heyrət, gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Nədir, yoxsa zənnincə etdim xəta?
Sus! Etməm xəta! Söyləməm nabəca!
Məzah etmiş oldum sanırsan bəsa?
Dodaqaltı gülmək nədir, söylə ya?
Sənə bəlkə bunlar zərafət gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Buyur qıl da dünyayə ətfi-nəzər!
Müsəlman kimi kim olub bəxtəvər?
Bu İran, o Türkiyə, həp bixətər!..
Əvət, başla, Fasdan Xətaya qədər
Baxıldıqca qəlbə məsərrət gəlir...
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

O Albanyada arnavud qeyrəti!
Bu Qəzvindəki mürtəce heyəti
Kiriddə müsəlmanların haləti!
Buxarada məzhəbçilər söhbəti!
Yəməndən də başqa rəvayət gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Bu Rusiyanın əhli-imanları
Ki, yəni bu səmtin müsəlmanları,
O yekşənbə, cümə, bu dükkanları,
O Dum macərası, bu vicdanları!..
Hələ etiraza nə hacət gəlir?
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Bu Qafqaz, bu da Qafqaz arifləri,
Bu da əhli-nazə təarüfləri,
Bu millət yolunda məsarifləri,
Bu da, şanlı-şanlı məarifləri!
Bulardan dəxi böylə xidmət gəlir,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Bunuyla belə biz neçün bəxtiyar
Olub etməyək də hələ iftixar?!
De nöqsanımız hankıdır, zinhar?
Bu – siyrət, bu – surət, bu – qeyrət, bu – ar...
Bizə ya nə nisbətlə töhmət gəlir?
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

—

Həp ətrafımızda bir əzmü səbat,
Bu əzmü səbat ilə bulduq nicat.
Bu gün cümləmiz bəkləriz bir həyat,
Bir əhval, bir fikr, bir iltifat,
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!



Hanı bizdə, yahu, nifaqü təzad?
Hanı bizdə həmdinimizlə inad?
Bu – ülfət, bu – rüfət, bu da – ittihad!
Bax, iştə, bu – məclis, bu da – iniqad!
Nə mabeynə nifrət, nə lənət gəlir!
Nə böhtan, nə hədyan, nə qiybət gəlir!
Nə cib, nə cibişdan, nə rüşvət gəlir!
Qaç, oğlan, qaç! At basdı! Millət gəlir!

*(..........)*

---

## HÜRRİYYƏT

Azadlıq İranda indi bu saat o qədərdir ki, İngiltərədə bu qədər deyil. Ən azad məmləkətdə hökumət məmurları üçün bir para müəyyən əmrlər yazılıb. Məsələn, polis zabiti bir keflini küçədə zornan çəkib polis idarəsinə apara bilər, yainki maliyyatı təbəələrdən almaqda müəyyən qanunlara müvafiq cəbr də eləyə bilər, əgər təbəələr öz borclarını verməк istəməsələr.

Bu barədə İranda indi görsənən azadlıq Firəngistanda da yoxdur. Əgər uzaqdan görürsən ki, hökumət məmuru gəlib səndən maliyyat istəyəcək, sən piş əzvəqt çıxart bir əcnəbi pasportu göstər və de ki, «mən İran rəiyyəti deyiləm». Vəssəlam. Dəxi bundan yaxşı fənd yoxdur. Nə hakim səni çağırıb ata-ananı söyə bilər, nə də səndən maliyyat istəyə bilər.

Bunlar keçəndən sora, bu hələ bir fəxrdir də səndən ötəri. Mən ölüm, düzünü de, belədirmi, ya yox? Başını bir qədər qalxız yuxarı (amma gözlə papağın düşməsin) və şəst ilə ucadan de:

«Mən İran rəiyyəti deyiləm».

Qurban olum qeyrətinə, daduşcan.

*Cırcırama*

---

## ELAN

## NƏCABƏT SATIRAM

Çox yaxşı əsl-nəcabətim var. Şəhərdə övrətdən, kişidən məni tanımayan yoxdur. Özüm də ruh elmindən xəbərdaram. Ölülərin nəbzini bilirəm. Nəcabətimə görə ölü öləndə mənə də pul verirlər. Amma bilirəm ki, hansı ölüdən alan pulu qumara qoymaq lazımdır və hansından alanı özgə şeyə sərf etməlidir. Bunları bilirəm. Qumarda da ki, tuli-yədim var. Güldəstə də məndə olmağına görə nə qədər övrətlərə nəcabət yetirmişəm. Əmizadələrim bilmiş olar. Qərəz, hər fənd desən, məndə var.

Adresim: Şeyx hamamının dalında xüsusi otaqlarım.

## ORENBURQDAN

Keçən sənə Musa Bikef tərəfindən oxunmuş leksiyaların səhv təsiri ilə etiqadları pozulmuş bəzi xalis «müsəlmanlar» fahişəxana və traktirləri buraxıb, qəzetə oxumaq kimi fəna adətlərə meyl və həvəs etməyə başlamışlarsa da, həmd olsun, mollaların və «Məişət» jurnalının nəsihəti ilə təkrar imanlarını təcdid edib, əskisi kimi sərxoşluq ilə, sokaklarda təsadüf edən arvadların arxasından gəzib «müsəlmanlıq əlaməti» göstərməyə başladılar.

---

Şimdiyə qədər iki ayda bir nəşr olunub sabi ruçkası qırılan «Çukəç» məcəlləsi abunəçilərin ricası üzrə bundan son hər sənədə bir dəfə nəşr olunacaq imiş.

---

Pudunu iki rubləyə satıb füqəra əhalinin dərisini soymaq əfkarı ilə qəhətlik bəkləyən məşhur Mahmud bəy yarım milyon pud buğdanı bu vaxta qədər saxlamış isə də yağmurlar çox olub havalar gözəl olduğundan buğdayı fiyəti pək aşağa endi. Bundan dolayı «bayın» kefi fənalaşmış deyirlər.

---

«Cəliliyyə» ulduzunun həlakətindən xilas olmuş yerli islamlar şadlıqlarından «Din və məişət» jurnalını oxuyurlar.

---

## ACIĞNAN

İranda bir şəhər var, adı Tənəkabundur. Burada bir hakim var. Bu hakimin iki arvadı var imiş. Duanəvis Seyid Əşrəf görür ki, hakimin iki arvadı var, bu da onun acığına üç arvad alır. Sora hakim eşidir ki, duanəvis Əşrəfin üç arvadı var, hakim acığnan bir arvad da alır və olur dörd arvadı.

---

## ZİYARƏTGAH

Ahənrud kəndində Ağa Seyid Əbdülgiyah adında bir büzürgüvarın ziyarətgahı var. Ziyarətgahın yaxınlığında bir məscid var. Məscidə yapışıqlı bir hərəmxana var. Haman hərəmxanada iki küp var, biri boş və birisi qara neft ilə doludur. Bu da Ağa Seyidülgihayın nəzər kərdəsidir. Dolu küp ildə iki dəfə cuşə gəlir: bir dəfə aşura gecəsi və bir dəfə də əhya gecəsi. Ətraf əhalisi həmişə yığışırlar buraya və neftdən təbərrük aparırlar. Neftin xasiyyəti budur ki, hər bir övrətin uşağı olmasa, bir

Ахъ, какъ намъ мѣшаетъ слава Саттаръ хана.

Ax, bu Səttar xanın şöhrəti qoymur ki, bizim də adımız çıxsın

Səttar xan

Vəkil və vəzirlər

Tehranda

Rotter

– Əgər buradan mənim yolumu kəsmək istəsəniz, qeyri yol tapa bilərəm.
– Если загородите мне путь – найду его съ другой стороны.

Tehranda

qətrə haman neftdən suya töküb içsə, dəfətən uşağa qalar. Hərçənd bir para qəlbiqaralar elə güman eləyirlər ki, bu neft haman Sabunçu neftidir ki, mütəvəllibaşı Şeyx Musa xan xəlvətcə gətirib tökür küpəyə. Amma bu söhbətlərin əsli yoxdur. Bu sözləri icad eləyənlər babilərdir.

*Mömin*

---

## NAXÇIVANDAN

«Mirəbdülhüseyn rövzəpəzin mərsiyəsi».

Bir neçə gün bundan irəli bizim şeyxin evində gecə təkyəsi var idi. Bəli, mən də getmişdim. Çoxlu söhbətlərdən və bir dərya limonlu çay içilib qəlyan, papiros çəkildikdən sora istul qoyuldu. Mir Dolaşıq cənabları yerində qərar tutub, salamlardan sora bir neçə dəfə öskürüb, bu növ ifadə xaricə verdilər: «Ay camaat! Mən ömrümdə bu evdə nə qədər dua eləmişəmsə, hamısı dərəceyi-icabətə çatıblar. Bu gecə də bəd dua eləyəcəyəm. Sizdən də təvəqqəm budur ki, uca səs ilə ürəkdən «amin» deyəsiniz, bəlkə Allah rəhm edib bu duamı da qəbul edə. Əvvəl başdan bunu deyirəm ki, Allah bizim olub-qalan mərifətimizi də əlimizdən alsın. Çünki qədim zamanlarda mən xırda idim və ata-babamızın da mərifətsiz vaxtları idi, görmüşdüm ki, qapıları döyüb məscidlərdə səqqaxana bəzəmək üçün paltar, palas və qeyri şeylər yığırdılar. Amma indi mərifətimiz artdığına evlərdə bizləri rahat qoymayıb, gecə ilə qapıları döyüb bir para yoldan azmışlar özlərini salıb deyirlər ki, balam, dur kürkünü ver, oyun çıxardacağıq, nə bilim əbanı ver, lazımdır. Xülasə, camaat! Ümidvaram, bu barədə bizə Allahın rəhmi gəlib biz biçarələri bu səfehlərin şərindən xilas edər.

Mərsiyəçilər bunu eşitcək bərk «amin» dedilər. Bizim şeyx də qulaq asıb bir söz demədi. Sora Ağa Mirpırtdaşıq mərsiyəni deyib qurtardı. Ağlaşanlar da gözlərinin yaşı tökülə-tökülə şeyxin evinin divarlarını öpə-öpə çıxıb getdilər. Məclis dağıldı.

*İmza: Cəddinə qurban olduğum*

---

## YUXU

Cəmadiəl - əvvəl ayının 7-də Vladiqafqaz mollası Molla İsmayıl yuxuda görür ki, Vladiqafqaz camaatının əvvəlinci mollası Axund Hacı Molla Məhəmmədhəsən Təbrizdə vəfat edib. Axund Molla İsmayıl bu yuxunu görəndən sora gəlir məscidə və camaata buyurur: «Həzarat! Mərhum Hacı Molla Məhəmmədhəsən 12 il zəhmət çəkib məscidinizi abad eləyib, o mərhumun sizin boynunuzda haqqı çoxdur. Mən eşitmişəm ki, onun vaxtında Vladiqafqazda şərəbxor, zinakar, bədbihesab bir nəfər də yox imiş. Görünür ki, o mərhumun sözlərinin əsəri var imiş. İndi lazımdır o mərhuma təziyə tutmaq».

Camaat axundun bu təklifinə razı olur, amma sabah tezdən behiştdən o mərhumdan Molla İsmayıl Həsənzadəyə bu məzmunda bir kağız gəlir:

«Ay namərd qardaş! Mən Vladiqafqazda olanda məni bircə gün də olsa qoymurdun öz əlim ilə abad etdiyim minbərdə öz camaatımıza vəz edəm; məni istəyirdin göndərəsən Ərəs çayının o tərəfinə, indi nə olub ki, istəyirsən mənə təziyə tutasan? Qardaş, fəndini duymuşam, indi də bu sayaq ilə istəyirsən camaatı tovlayasan. Bağışlayasan, sənin fəndini hamı başa düşüb. Heyf olsun ki, qiyamət günü bizim aramız çox uzaq olacaq, yoxsa sənə çox sözlər deyərdim.

Bu kağızdan sora təziyə baş tutmadı.

*İmza: Qəmişqulu*

---

## NƏZİR

Molla əmi! Bu üsuli-cədid çıxandan sora, bu milli məktəblər əmələ gələndən sora lap işlər xarab olubdur. A kişi, sənin canın üçün, uşaqlar da bicləşiblər, harda üsuli-cədid varsa, yüyürürlər oraya. Çubuq, falaqqa aradan çıxandan bəri həya-abır da qalmayıbdır. Qülhüvəllahbaşı, əlhəmdbaşı, yasinbaşı, isti çörək, çaharşənbə yemişi, novruz yumurtası, sünnət şirnisi dəbdən düşüb, xeyir-bərəkət qalmayıbdır. Bu işləri bir qaydaya qoymaq lazımdır. Milli məktəbi dağıtmaq üçün çox çalışdım, olmadı. Bundan ona, ondan buna tərsinə xəbər apardım, olmadı. Özümə bir neçə yoldaş tapdım, genə olmadı. Üsuli-cədid müəllimi çaxır içir dedim, olmadı. Birtəhər oldu, amma mən deyən kimi olmadı. Qərəz, nə başını ağrıdım, çox fənd işlətdim, olmadı. Axırı əlacım hər yerdən kəsilib nəzir etdim ki, milli məktəb dağılsın, sileyi-irhami ziyarət edərəm və Əliabad qəryəsində genə də gedib bir «Fatihə» oxuyaram, sən də de, Allah qəbul eləsin. Mənə demə ki, heç şeydən xəbərim yoxdur. Xəbərim var.

*İmza: Müəllimbaşı Molla Peysər*

---

## ZƏLZƏLƏ

Nainsaf müsəlmanlar padşahlıq Dumanı peşiman elədilər. Məlumdur ki, axır vaxtlarda padşahlıq Duma qərar qoymuşdu ki, bazar tətilinə müsəlmanlar da şərik olsunlar, yəni həftədə tək bircə bazar günü dükanları bağlasınlar (yəni cümə məsələsi təşrif apardı).

Lazımdır bunu da ərz etmək ki, bu qərardaddan biriki gün sora Orenburq, Kazan tatarları tərəfindən Duma üzvlərinə bərk şikayətlər gəlmişdi. Lakin bu şikayətə qulaq asan yox idi. Çünki Peterburqda da bilirlər ki, müsəlmanların bir atımlıq barıtı var.

Amma axırda işlər özgə surətə mindi. Qarelərimiz, söz yox, teleqraf xəbərlərində oxudular ki, İrəvan müsəlmanları öz içlərindən bir heyət seçib Peterburqa göndəriblər ki, Duma üzvləri ilə xüsusi surətdə danışıb, onları yola gətirsin ki, müsəlmanların cümələrini özlərinə qaytarsınlar. Bu heyətə daxil olan cavanların yeddi nəfəri advakatdır, qalanı həkim, injener və müəllim. Bunların dörd

nəfəri Təpəbaşı məhləsindəndir, dörd nəfəri Dəmir Bulaqdan. Qalanı Daşlı küçədən və Xurran bulağındandır.

Aşkar şeydir, bu vəkillər Peterburqa yetişən kimi şəhəri altı-üstünə çevirəcəklər.

Allah axırın xeyir eləsin.

*Lağlağı*

**ELAN**

Naxçıvan məscidi-cameinin içəri həyəti kəklik döyüşdürmək üçün münasib yer olduğundan keçən gün bir neçə nümunə olundu.

Bundan belə kəklikbazlar təşrif gətirə bilərlər.

## ƏDLİYYƏ

Rəşt ədliyyəsinin sədri aprelin 23-də bir nəfərin üstünə 44 tümən kəsdi və qətnaməni oxuyanda dedi ki, «heç rus prokuroru da belə iş qət eləməyib».

## MƏKTUB

Cənab Molla Nəsrəddin əmidən xahiş edirəm ki, mənim bu məktubumu çap eləsin.

Həmişə söz düşəndə deyirlər ki, qızı zor ilə ərə verməkdə qarabağlıların şöhrəti var. Biz bu sözə razı deyilik. Səbəbi budur ki, doğrudur, bizlərdə qızları xirtdəyindən yapışıb mindirərlər ata və başına bir-iki qapaz vurub sakit edərlər, amma dəxi bundan savayı bir biabırçılıq olmaz.

Amma di gəl Tiflisə: burada elə bir həyasızlıqlar olur ki, qəzetlərə salırlar. Məsələn, bu günlərdə bir qıza zoman toy eləyirlərmiş. Oğlan evində toy çalınan vaxt xəbər gəlir ki, qız qoşulub qaçıbdır. Hələ indi axtarırlar, qızı tapa bilmirlər.

Bax, məzəli iş budur, nəinki bizim işlərimiz.

*İmza: Bir nəfər qarabağlı*

## TELEQRAM

Tehran. Bu gün bələdiyyə vəkili Hacı Seyid Həsən ağa hamama getdi.

## POÇTA QUTUSU

Aşqabadda «İvanov»a: Hacı Hüseyn barəsində yazılan çap olunmayacaq.

***

Yekaterinodarda «Qarpız mürəbbəsi»nə: Məktubumuzu oxuduq. Hələ ki, bir söz deyə bilmərik.

***

Ağdaşda «Əqrəb»ə: Bəyin əhvalatı çirklidir. Çap edə bilmərik.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Möhtərəm oxucularımıza lazım bilirik xəbər verək ki, bundan sora bir neçə vaxt jurnalımızda əlahiddə elan vərəqələri çap olunmayacaq.

## ELANLAR




– Ay arvad, görürsən ki, bizim qarabaşımız doqquz yaşını ötüb, dəxi mənə naməhrəm olub. Əgər müvafiqi-şəriət bir yüngülvari siğə aramızda olmasa, mən hər dəqiqə günaha batacağam.